"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"

H.Əliyev




Heydər Əliyev 100






**Mən əminəm ki, Qarabağda yaşayan erməni əhalisi tezliklə yaxşılığa doğru dönüşü görəcək.** Çünki bizim niyyətimiz sülh, qarşılıqlı anlaşma, qarşılıqlı hörmət əsasında birgə həyat qurmaqdır. Bizim erməni xalqı ilə heç bir problemimiz yoxdur, ədavətimiz də yoxdur.




## UĞURLU NƏTİCƏLƏRDƏN YENİ HƏDƏFLƏRƏ DOĞRU
















*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Sentyabr 2023 / № 5 (1123)

# Almaniya və Qazaxıstandan olan alimlər ADPU-da olublar





Almaniyanın Fridrix-Aleksandr Erlangen-Nürnberq Universitetinin (FAU) doqquz nəfər və Qazaxıstanın Qazax Milli Pedaqoji Universitetinin (KazNPU) doqquz nəfər əməkdaşından nümayəndə heyətləri 31 may – 7 iyun tarixlərində Bakıda, Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) səfərdə olublar.

Qeyd edək ki, 2021-2023-cü illəri əhatə edən "Pedaqoji peşəkarlıq və beynəlmiləlləşmə – Postsovet İslam Təhsil Məkanı ilə Dialoq" adlı layihə dövründə ADPU-nun da bir qrup əməkdaşı iki dəfə Almaniyada və bir dəfə Qazaxıstanda səfərdə olmuşlar. Səfər çərçivəsində müxtəlif seminarlar və təlimlər keçirilib, ADPU-nun artıq iki ildir əməkdaşlıq etdiyi "ABC Azərbaycan Britaniya Kolleci" məktəb-lisey kompleksinə və ADPU-nun Quba filialına səfərlər təşkil edilib.

Qeyd edək ki, iyun ayının 5-6-da layihə çərçivəsində ADPU-da "Multilingualism, internationalization, digitalization as factors of innovations in teacher education" ("Çoxdillilik, beynəlmiləlləşmə, rəqəmsallaşma müəllim hazırlığında innovativ amillər kimi") mövzusunda beynəlxalq konfrans keçirilib.

# Türkiyə Maarif Vəqfinin nümayəndələri ADPU-nu ziyarət ediblər

İyunun 2-də ADPU-da Türkiyə Maarif Vəqfinin nümayəndə heyəti ilə görüş keçirilib.

Görüşdə ADPU-nu universitetin rektoru professor Cəfər Cəfərov, beynəlxalq əlaqələr üzrə prorektor professor Mahirə Hüseynova, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, Tədris Departamentinin direktoru dosent Sənan Əliyev, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Gülnar Ələkbərova və Taisa Mamedova, Türkiyə Maarif Vəqfini isə qurumun Azərbaycan üzrə ölkə təmsilçisi dr. Sərdar Gündoğan, Beynəlxalq Maarif Məktəblərinin direktoru Ertuğrul Toy, Türkiyə Maarif Vəqfinin Azərbaycan təmsilçiliyinin təhsil işləri üzrə koordinatoru Əzim Heydərov təmsil ediblər.

"Bir millət, iki dövlət" prinsipi əsasında qurulan münasibətlərin yüksək səviyyədə olduğunu bildirən ADPU-nun rektoru prof. C.Cəfərov görüşün keçirilməsindən məmnun qaldığını bildirərək, yüksək səviyyədə inkişaf edən Türkiyə-Azərbaycan münasibətlərinin bütün Türk dünyası üçün layiqli nümunə olduğunu qeyd edib. Rektor Cəfər Cəfərov, həmçinin ADPU-da həyata keçirilən islahatlar, infrastrukturun yenilənməsi, təhsilin keyfiyyətinin yaxşılaşdırılması, təhsilin beynəlmiləlləşdirilməsi, beynəlxalq əlaqələrin genişləndirilməsi, xarici dillərin tədrisinin səviyyəsinin yüksəldilməsi sahəsində gerçəkləşdirilən tədbirlər barədə ətraflı məlumat verib.



Türkiyə Maarif Vəqfinin Azərbaycan üzrə ölkə təmsilçisi dr. Sərdar Gündoğan Vəqf ilə Pedaqoji Universitetin ortaq tədbirlər təşkil etməsi və qarşılıqlı tələbə-müəllim mübadiləsinin həyata keçirilməsinin prespektivlərini qeyd etdi.

Yekunda Sərdar Gündoğan ADPU-nun Türk Araşdırmaları Elmi-tədqiqat Mərkəzini ziyarət etdi və universitetlə tanış oldu.

# ADPU-nun prorektoru Beynəlxalq Təhsil İşçiləri Assosiasiyasının konfransında iştirak edib

ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva Amerika Birləşmiş Ştatlarının (ABŞ) paytaxtı Vaşinqtonda Beynəlxalq Təhsil İşçiləri Assosiasiyasının (NAFSA) "İnklüziv gələcəyə ilham vermək" ("Inspiring an Inclusive Future") başlığı ilə keçirilən 75-ci İllik Konfransı və Sərgisində iştirak edib.

Qeyd edək ki, NAFSA – Beynəlxalq Təhsil İşçiləri Assosiasiyası beynəlxalq təhsil və mübadilə ilə məşğul olan dünyanın ən böyük assosiasiyasıdır. Həmçinin, NAFSA beynəlxalq ali təhsili inkişaf etdirməyə çalışan peşəkarların ən böyük və hərtərəfli birliyidir. NAFSA 160-dan çox ölkədə 3500-dən çox qurumda 10 000-dən çox üzvün təhsil və peşəkar inkişafla bağlı ehtiyaclarına xidmət göstərir. NAFSA beynəlxalq təhsil və əməkdaşlıq vasitəsilə daha yaxşı bir dünya üçün təbliğat işinə liderlik edir.

May ayının 29-dan iyun ayının 2-nə qədər keçirilən konfransda prorektor Könül Pirverdiyeva ABŞ-nin və qlobal universitetlərin beynəlxalq təhsil liderləri ilə görüşlər keçirmiş, institusional tərəfdaşlıq quraraq, Azərbaycan universitetlərini ABŞ universitetləri üçün potensial tərəfdaş kimi təmsil etmişdir.

Bundan əlavə, Vaşinqtona səfər çərçivəsində K. Pirverdiyeva Azərbaycan Respublikasının ABŞ-dakı Səfirliyinin dəvəti ilə Azərbaycan Respublikasının Müstəqillik Günü və Silahlı Qüvvələr Günü münasibətilə keçirilən rəsmi tədbirdə iştirak etmişdir.



# Birləşmiş Krallığın Koventri Universitetinin nümayəndələri ADPU–nu ziyarət ediblər



İyunun 8-fə Böyük Britaniya Birləşmiş Krallığının Koventri Universitetinin prorektor müavini professor Riçard Deşvud və professor Maykl Hardi ADPU-nu ziyarət ediblər. Görüşə, həmçinin Azərbaycan Turizm və Menecment Universitetinin (ATMU) Beynəlxalq əlaqələr şöbəsinin müdiri Orxan Musa qatılıb.

Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov, rektorun müşaviri Ümid Mehdiyev, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və mütəxəssis Taisa Mamedova iştirak ediblər.

Görüş zamanı tərəflər təmsil etdikləri universitetlərin tarixi, strukturu, təhsil proqramları barədə bir-birini məlumatlandırıb, beynəlxalq tədqiqatlarda birgə çalışmaq, universitetlərarası əlaqələri inkişaf etdirmək və beynəlxalq həmmüəlliflərlə məqalələr dərc etdirmək arzusunu ifadə ediblər. Bundan əlavə, ikili diplom sahəsində mümkün əməkdaşlıq imkanları müzakirə olunub və belə əməkdaşlığın qarşılıqlı faydalı olacağı vurğulanıb.

Yekunda qonaqlar ADPU-nun tədris binası ilə tanış olublar.

# ADPU-nun prorektoru Elm və Təhsil Nazirliyinin Akkreditasiya Şurasının yeni tərkibində təmsil olunur



İyunun 8-də Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin Akkreditasiya Şurasının yeni tərkibdə ilk iclası keçirilib.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva da Şuranın yeni tərkibində təmsil olunur.

İclasda bir sıra ali təhsil müəssisələrində həyata keçirilmiş institusional akkreditasiya qiymətləndirməsi əsasında müvafiq komissiyalar tərəfindən hazırlanmış hesabat və təhlillər təqdim edilib.

Qeyd edək ki, Akkreditasiya Şurasına elm və təhsil naziri Emin Əmrullayev sədrlik edir. Şuranın iclasları Nazirlər Kabinetinin müvafiq qərarı ilə təsdiq edilmiş "Təhsil müəssisələrinin akkreditasiyası Qaydaları"na uyğun olaraq təşkil olunur. İclaslarda təhsil və ya müvafiq elmi-tədqiqat sahələrinin mütəxəssisləri, işəgötürənlər, təhsilalanlar, eləcə də tabeliyində təhsil müəssisəsi olan nazirlik, təşkilat və idarələrin, qeyri-hökumət təşkilatlarının nümayəndələri iştirak edirlər.

## ADPU-ya növbəti 5 il üçün akkreditasiya şəhadətnaməsi təqdim olunub



Avqustun 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) rektor professor Cəfər Cəfərov ilə Təhsildə Keyfiyyət Təminatı Agentliyinin (TKTA) İdarə Heyətinin sədri Ülkər Səttarova arasında görüş keçirilib.

Rektor Cəfər Cəfərov vurğulayıb ki, ali təhsil müəssisələrinin institusional akkreditasiyası üzrə detallı meyarların hazırlanması və akkreditasiya prosesinin keçirilməsi hər bir ali məktəbə, o cümlədən ADPU-ya öz fəaliyyətinə meyarlar əsasında obyektiv xarici baxışla tanış olmaq və növbəti strateji planlaşdırmalarında bu nəticələrə istinad etməyə imkan verir. Rektor bildirib ki, ADPU kollektivi universitetin 2016-2022-ci illərdəki fəaliyyətini əhatə edən institusional akkreditasiya prosesindən uğurla keçib.



TKTA
Təhsildə Keyfiyyət Təminatı Agentliyi

İNSTİTUSİONAL AKKREDİTASİYA ŞƏHADƏTNAMƏSİ
INSTITUTIONAL ACCREDITATION CERTIFICATE
№ AC00000003

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ
AZERBAIJAN STATE PEDAGOGICAL UNIVERSITY

Akkreditasiya Şurasının 8 iyun 2023-cü il tarixli 1 nömrəli qərarı ilə 5 (beş) il müddətində akkreditasiya olunmuşdur.
has been accredited for 5 (five) years by decision № 1 of the Accreditation Council, dated 8 June, 2023.

İdarə Heyətinin sədri
Chairperson of the Management Board
Ülkər Səttarova

İmzalanma tarixi: / Date of sign: 28.07.2023 12:02:04
Verilmə tarixi: / Date of issue: 08.06.2023
Etibarlıdır: / Valid through: 2023/2028

DİQQƏT! Sənədin yoxlanılması üzərində olan QR kodu skan etməklə və ya Təhsildə Keyfiyyət Təminatı Agentliyinin rəsmi veb səhifəsi vasitəsilə mümkündür: www.tkta.edu.az. Akkreditasiya barədə şəhadətnamənin elektron formada verilməsi Azərbaycan Respublikası Nazirlər Kabinetinin müvafiq qərarı ilə tənzimlənir. Təhsildə Keyfiyyət Təminatı Agentliyi (TKTA), Azərbaycan, Bakı, Q.Qarayev prospekti 28, AZ1060.
ATTENTION! The verification can be done by scanning the QR code on the document or through the official website of the Education Quality Assurance Agency: www.tkta.edu.az. The accreditation certificate is issued digitally according to corresponding decision of the Cabinet of Ministers of the Republic of Azerbaijan. AZ1060, G.Garayev Ave., 28, Baku, Education Quality Assurance Agency (TKTA).

TKTA-nın İdarə Heyətinin sədri Ülkər Səttarova akkreditasiya prosesinin təhsilin müxtəlif pillələrində keyfiyyətin təminatı sisteminin qurulması və tətbiqinə xidmət etdiyini diqqətə çatdıraraq, akkreditasiya prosesini uğurla başa vurduğuna görə ADPU kollektivini təbrik edib, Universitetə gələcək fəaliyyətində uğurlar arzulayıb. Çıxış edən ADPU-nun tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov diqqətə çatdırıb ki, institutisional akkreditasiya prosesini uğurla tamamlayan ADPU növbəti mərhələ kimi proqram akkreditasiyasını səbirsizliklə gözləyir.

Daha sonra Agentliyin İdarə Heyətinin sədri rektor Cəfər Cəfərova Elm və Təhsil Nazirliyinin Akkreditasiya Şurasının 8 iyun 2023-cü il tarixli qərarı ilə ADPU-nun 5 il müddətində akkreditasiya olunması ilə bağlı şəhadətnaməni təqdim edib.

Sonda TKTA-nın İdarə Heyətinin sədri Ülkər Səttarova ADPU-nun qonaq kitabına ürək sözlərini qeyd edib.

## ADPU-da sabahın təhsili müzakirə olundu: Təhsilimiz: dünəndən sabaha

İyunun 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Təhsilimiz: dünəndən sabaha" adlı elmi-praktik konfrans keçirilib. Konfrans Elm və Təhsil Nazirliyi, Təhsilin İnkişafı Fondu, Bakı şəhəri üzrə Təhsil İdarəsi (BŞTİ) və ADPU-nun təşkilatçılığı ilə baş tutub. Humanist Pedaqogika üzrə Beynəlxalq Təhsil Təşkilatları Assosiasiyasının prezidenti, Əməkdar müəllim Asif Cahangirovun 75 illiyinə həsr edilən konfransa Qazaxıstan, Yeni Zelandiya, Rusiya, Gürcüstan və Azərbaycandan elm və təhsil xadimləri qatılıblar. Konfransın məqsədi dünəndən sabaha yönələn təhsili müzakirə etmək, təhsildə keyfiyyətin yüksəldilməsinə nail olmaq üçün perspektivləri nəzərdən keçirmək, qabaqcıl beynəlxalq təcrübə və yeni yanaşmalarla tanış olmaqdır.

"Optimist baxışlarla" devizi altında "T-Network" platformasının rəhbəri Cəfər Mənsiminin moderatorluğu ilə keçirilən tədbirdə əvvəlcə yubilyarın elmi-pedaqoji fəaliyyətindən bəhs edən videoçarx nümayiş olunub.

Açılış nitqi ilə çıxış edən Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov yerli və xarici qonaqları salamlayaraq, konfransın işinə uğurlar arzulayıb, Elm və Təhsil Nazirliyinin dəstəyi ilə ADPU-da pedaqoji fikirin inkişafına dair, eləcə də, pedaqoji elmə töhfələr verən böyük alimlərin irsinin tanıdılmasına həsr olunmuş tədbirlərin keçirilməsinin ənənə xarakteri aldığını diqqətə çatdırıb.

Rektor vurğulayıb ki, təhsil sahəsində zəngin təcrübəyə və dayanıqlı səriştələrə malik olan Asif Cahangirov oxumaqdan, öyrənməkdən, təbliğ etməkdən zövq alır, təhsil sahəsində daim istiqamətverici tövsiyələr verir. Prof. C.Cəfərov bildirib ki, Asif müəllim ADPU-nun yaxın dostudur, mütəmadi olaraq o, burada keçirilən konfranslara qatılır, ustad dərsləri verir, universitetin təşkil etdiyi "Pedaqoji forum"da dünya təhsilindəki yeniliklərlə bağlı məruzələr edir.

Rektor çıxışının sonunda Asif Cahangirova xatirə hədiyyəsi təqdim edib.



Çıxış edən elm və təhsil naziri Emin Əmrullayev son bir əsrdə Azərbaycan təhsilinin inkişafının müxtəlif ictimai-siyasi şəraitlərdən keçərək bir çox sınaqlara məruz qaldığını diqqətə çatdırıb. Vətən müharibəsindəki tarixi zəfərimizə toxunan Emin Əmrullayev diqqətə çatdırıb ki, bu il ilk dünyəvi məktəbimiz olan Şuşa şəhəri 1 nömrəli məktəbin təmirdən sonra açılışı olacaq. Bu, tarixi zəfərimizin və Azərbaycan təhsilinin böyük simvoludur.

Elm və təhsil naziri çıxışında Azərbaycan təhsilində tədqiqatlara əsaslanan elmiliyi artırmağın zəruriliyini vurğulayıb. Nazir "Azərbaycan Respublikasının 2022-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası"nda 2026-cı ilə qədər olan dövr üçün təhsilin inkişafı baxımından əsas hədəflərin əks olunduğunu və bu istiqamətdə planlı fəaliyyətin icra edildiyini bildirib.

Sonda nazir qeyd edib ki, təhsilin inkişafında son illərin əhəmiyyətli yanaşmalarından biri də Azərbaycanın beynəlxalq qiymətləndirmə tədqiqatlarına qatılmasıdır.

Sonra Əməkdar müəllim Asif Cahangirov "Sabahın məktəbi: yeni yanaşmalar", Humanist Pedaqogika üzrə Beynəlxalq Mərkəzin fəxri prezidenti, Rusiya Təhsil Akademiyasının həqiqi üzvü, psixologiya elmləri doktoru, professor Şalva Amonaşvili "Humanist pedaqogikanın yaşıl rəngli qələmi", Yeni Zelandiyadan olan təhsil üzrə məsləhətçi Qreem Pollok, "Akkreditasiyaya müasir yanaşma yolu ilə məktəb mədəniyyətinin inkişafı", Bakı Slavyan Universitetinin prorektoru, Əməkdar müəllim, dosent Ənvər Abbasov "Ali məktəbdə tədris prosesi: onu necə maraqlı etmək olar?", Qazaxıstan Təhsil Akademiyasının həqiqi üzvü, psixologiya elmləri doktoru, sosiologiya elmləri doktoru, professor Aleksandr Teslenko "KZ nəslinin mədəni sosiallaşması kontekstində gənclərlə işin qurulması", BŞTİ-nin müdiri Mehriban Vəliyeva "Məktəb transformasiyası", Humanist Pedaqogika üzrə Beynəlxalq Mərkəzin prezidenti, psixologiya elmləri doktoru, professor Paata Amonaşvili "Basti Bubu və Mzianeti: humanist pedaqogikanın əyani təcrübəsi", Avropa Azərbaycan Məktəbinin direktoru, Qafqaz və Mərkəzi Asiya üzrə Beynəlxalq Məktəblər Assosiasiyasının sədri, Beynəlxalq Məktəblər Şurası İdarə Heyətinin üzvü Françesko Bankini isə "Müasir müəllimi necə müasirləşdirməli: innovativ yanaşmalar" mövzusunda çıxış ediblər.

Tədbirdə Asif Cahangirova Humanist Pedaqogika üzrə Beynəlxalq Mərkəzin ali mükafatlarından olan "Ruh qəhrəmanı" ordeni təqdim olunub.

Elmi-praktik konfrans bədii qiraət dəqiqələrindən sonra müzakirələrlə davam etdirilib.

## Konfrans: Böyük xilaskarlıq missiyası

İyunun 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev Mərkəzində Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə və Milli Qurtuluş Gününə həsr olunmuş "Böyük xilaskarlıq missiyası" adlı konfrans keçirilib.

Mərkəzin müdiri Tahir Süleymanovun moderatorluğu ilə baş tutan tədbirin əvvəlində həm Ulu Öndərin, həm də Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda şəhid olmuş bütün həmvətənlərimizin xatirəsi sükutla yad edilib, sonra Heydər Əliyevin 1969-2003-cü illərdəki fəaliyyətini əks etdirən sənədli film nümayiş olunub.

Giriş nitqi ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov qeyd edib ki, fenomenal şəxsiyyət olan Heydər Əliyev öz ölkəsinə iki dəfə, bir-birindən köklü şəkildə fərqlənən iki sosial-iqtisadi və siyasi sistem şəraitində uğurla rəhbərlik edə bilmiş nadir liderlərdəndir. Onun Azərbaycana ilk dəfə başçılıq etdiyi 1969-1982-ci illərdə Respublika əksər göstəricilərə görə Sovet İttifaqında qərarlaşdığı sonuncu pillələrdən ön mövqelərə yüksəlib, təhsilin, səhiyyənin, mədəniyyətin və cəmiyyət həyatının digər sahələrinin inkişafı sahəsində təsirli tədbirlər görülüb. Həmin dövrdə yüz minlərlə insan yeni mənzillərə köçüb, əhalinin bütün təbəqələrinin həyat səviyyəsi və maddi durumu əhəmiyyətli dərəcədə yaxşılaşıb. Bütün bunlara görə, 1990-cı illərin əvvəllərində iqtisadi tənəzzül misli görünməmiş həddə çatanda, rayonlar bir-birinin ardınca işğal olunanda xalqımız yenidən üzünü məhz Ümummilli Liderə tutdu. 1993-cü ildə xalqın təkidli tələbi ilə Ulu Öndərin rəhbərliyə dəvət edilməsi ölkəni xaos, anarxiya və alovlanmaqda olan vətəndaş müharibəsi təhlükəsindən xilas etdi.



Heydər Əliyevin müstəsna qətiyyəti, iradəsi və idarəçilik təcrübəsi sayəsində qanunsuz silahlı birləşmələr zərərsizləşdirildi, hakimiyyəti zorakı yollarla devirmək praktikasına birdəfəlik son qoyuldu. Görülən məqsədyönlü tədbirlər və həyata keçirilən islahatlar nəticəsində iqtisadi tənəzzül və hiperinflyasiya meyilləri tədricən aradan qaldırıldı, 90-cı illərin ikinci yarısından etibarən Azərbaycan davamlı inkişaf yoluna qədəm qoydu.

Rektorun çıxışından sonra fəlsəfə elmləri doktoru, professor Əyyub Kərimov "Azərbaycan sürətli inkişaf yollarında (1969-1987-ci illər)", Azərbaycan tarixi kafedrasının müdiri dosent Naibə Əhmədova "Qurtuluşdan inkişafa: müdrik siyasətin uğurlu nəticələri (1993-2003-cü illər)" mövzularında məruzə ediblər. "91-lər"in nümayəndəsi, Cəbr və həndəsə kafedrasının dosenti Heydər Hüseynov YAP-ın yaradılması prosesi və Ümummilli Liderlə bağlı xatirələrini danışıb.

Tədbirin gedişində Uşaq xorunun ifasında "Sən elə bir zirvəsən", gənc müğənni Vüqar Muradovun ifasında "Ulu bir sərkərdə, Ulu bir Öndər" mahnıları dinlənilib. Filologiya fakültəsinin tələbəsi, "Meh" ədəbi dərnəyinin üzvü Camilə Məmmədova Xalq şairi Zəlimxan Yaqubun "Ömrün Heydər zirvəsi" şeirini səsləndirib.

## ADPU-da beynəlxalq elmi seminar: Heydər Əliyev və Türk dünyası



İyunun 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Türkoloji mərkəzdə "Heydər Əliyev və Türk dünyası" adlı beynəlxalq elmi seminar keçirilib. Seminarda AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun baş direktoru professor Nadir Məmmədli, Azərbaycan Respublikası Nazirlər Kabineti yanında Terminologiya Komissiyasının sədr müavini professor Sayalı Sadıqova, Azərbaycan Respublikasının Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzinin direktoru professor Sevinc Əliyeva, professor Həbib Zərbəliyev, professor Hüseyn Əsgərov, professor Nizami Tağısoy, f.e.d. Şəbnəm Həsənli, habelə, ADPU-da səfərdə olan Özbəkistan nümayəndə heyətinin üzvləri və Türkiyə, Qazaxıstan, Qırğızıstan və Rusiyadan onlayn qoşulan alimlər iştirak ediblər.

Beynəlxalq elmi seminarda açılış sözü ilə çıxış edən ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, Türkoloji mərkəzin rəhbəri professor Mahirə Hüseynova qeyd edib ki, Türk dünyası ilə sıx qarşılıqlı əlaqələrin qurulması və bərpası Ulu Öndər Heydər Əliyevin fəaliyyətində əsas xətlərdən birini təşkil edir. Bütün Türk dünyasının böyük oğlu olan Heydər Əliyevin 100 illik yubileyi qardaş türk ölkələrində də silsilə tədbirlərlə qeyd olunur.

Açılış nitqindən sonra müxtəlif xarici ölkələrdən beynəlxalq seminara qatılan alimlərdən prof. Şükrü Haluk Akalın "Heydər Əliyevin elm və təhsil mövzulu məqalə, çıxış və açıqlamalarının lüğət tərkibi ilə bağlı araşdırma" (Türkiyə), Yekaterinburq Ural Federal Universitetinin Beynəlxalq münasibətlər departamentinin Xarici regionşünaslıq kafedrasının müdiri, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin Yekaterinburq filialının icraçı direktoru prof. Aleksandr Nesterov

"Qərbi Azərbaycan: regionun tarixi konsepsiyası" (Rusiya), Rusiya Elmlər Akademiyasının akademiki, Çinin Xeksi Universitetinin dəvət olunmuş professoru, Şakarima adına Qazaxıstan Dövlət Universitetinin fəxri professoru Baybolot Abıtov "Sovet və postsovet Azərbaycanının fövqəladə və yaradıcı şəxsiyyəti: Heydər Əliyev" (Qırğızıstan, Oş Dövlət Universiteti), prof. Burhan Sayılır "Heydər Əliyev dövründə Türkiyə-Azərbaycan əlaqələri" (Türkiyə, Anadolu Universiteti), akad. Alimjan Xamrayev "Heydər Əliyev dövründə Qazaxıstan-Azərbaycan ədəbi əlaqələri" (Qazaxıstan) və Eskişehir Azərbaycanlılar Dərnəyinin rəhbəri Cavid Aydın "Heydər Əliyev və Azərbaycan diasporu" (Türkiyə) mövzularında onlayn formatda məruzələrlə çıxış ediblər.

Daha sonra Türkoloji mərkəzin Türk ədəbiyyatı bölməsinin müdiri prof. Elman Quliyev "Heydər Əliyev və türk xalqları ədəbiyyatı", mərkəzin Türk dilləri bölməsinin müdiri prof. Mirvari İsmayılova isə "Heydər Əliyev və türk mənəvi dəyərləri" mövzularında məruzə ediblər.

## Professor Cəfər Cəfərov Kokand Dövlət Pedaqoji İnstitutunun fəxri professoru adına layiq görülüb

İyunun 13-də Özbəkistanın Mukimi adına Kokand Dövlət Pedaqoji İnstitutunun rektoru Dilnoza Xocayeva, tədris hissəsinin prorektoru Nargiza Babayeva, Təhsilin keyfiyyətinə nəzarət şöbəsinin müdiri Oybek Bozorov, Birgə təhsil proqramlarının koordinasiya şöbəsinin müdiri Şahnoza Qarşiyeva, Pedaqoji fakültənin dekanı Nigora Erkaboyeva, İbtidai təhsil fakültəsinin dekanı Dilnoza Camoliddinova, Rus dili və ədəbiyyatı kafedrasının müdiri Nigora Kodirova, və Planlaşdırma və maliyyə şöbəsinin müdiri Nodir Xolikovdan ibarət nümayəndə heyəti Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olublar.



Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, beynəlxalq əlaqələr üzrə prorektor professor Mahira Hüseynova, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, mütəxəssislər Taisa Mamedova və Gülnar Ələkbərova iştirak ediblər.

Görüş zamanı tərəflər təmsil etdikləri universitetlərin tarixi, strukturu, təhsil proqramları barədə bir-birini məlumatlandırıb, universitetlərarası əlaqələri inkişaf etdirmək, təcrübə mübadiləsi aparmaq və beynəlxalq proqramlarda və layihələrdə qarşılıqlı əməkdaşlıq etmək arzusunu ifadə ediblər.

ADPU-nun rektoru professor Cəfər Cəfərov mədəniyyət və incəsənət, elm, təhsil və beynəlxalq əlaqələrin inkişafındakı səmərəli xidmətlərinə görə rektor Dilnoza Xocayeva tərəfindən Kokand Dövlət Pedaqoji İnstitutunun fəxri professoru adı ilə təltif olunub. Qonaqlar, həmçinin Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Türkoloji Mərkəzdə "Heydər Əliyev və Türk dünyası" adlı beynəlxalq elmi seminarda iştirak ediblər.

Sonda qonaqlar universitetin binası, mərkəzləri və auditoriyaları ilə tanış olublar.

## ADPU-nun Corc Vaşinqton Universiteti ilə birgə ikili diplom proqramının ikinci məzun buraxılışı keçirildi

İyunun 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Amerika Birləşmiş Ştatlarının (ABŞ) tanınmış ali təhsil ocaqlarından olan Corc Vaşinqton Univereiteti (CVU) ilə birgə ikili diplom magistr proqramının ikinci məzun buraxılışı günü keçirilib. Bakı şəhərində təşkil olunan mərasimdə Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayev, "BP Azərbaycan" şirtətinin vitse-prezidenti Bəxtiyar Aslanbəyli, CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin professoru Kolin Qrin, habelə diplomatik korpus özəl sektor unnümayəndələri, ali və orta ixtisas təhsili müəssiələrinin rəhbərləri, ADPU və Corc Vaşinqton Universitetinin nümayəndələri və proqramın məzunları iştirak ediblər. Əvvəlcə təntənəli məzun himninin sədaları altında universitetlərin bayraqları zala gətirildi, proqramın müəllim və tələbələri zala daxil oldular və proqramla bağlı videoçarx nümayiş olundu. Mərasimdə açılış nitqi söyləyən ADPU-nun rektoru professor Cəfər Cəfərov qeyd etdi ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində bir neçə ali təhsil müəssisələrində ikili diplom proqramları təsis edilib ki, bu proqramlardan ilki məhz Pedaqoji Universitet ilə ABŞ-nin Corc Vaşinqton Universiteti arasında imzalanıb.



Rektor vurğuladı ki, 3 ildir icra olunan proqramdan ötən il ilk məzun olan 22 nəfər indi təhsil və ölkə iqtisadiyyatının müxtəlif sahələrində, özəl və dövlət sektorunda, eləcə də ictimai sektorda uğurla fəaliyyət göstərir. Bu gün isə proqramı uğurla başa vuran növbəti 19 nəfərin məzun buraxılışını qeyd edirik.

Prof. Cəfər Cəfərov diqqətə çatdırdı ki, XXI əsrdə milli-mənəvi dəyərlərə bağlı, yaradıcı təfəkkürlü və müasir dünyagörüşlü, dərin savadlı və praktik səriştəli, rəqəmsal və xarici dil biliklərinə sahib olan gənc mütəxəssislər və fəal vətəndaşlar yetişdirmək hədəfinə çatmaq üçün proqram ADPU-nun təcrübəsini Corc Vaşinqton Universitetinin təhsil elmləri sahəsindəki zəngin təcrübəsi ilə birləşdirmək, bu təcrübəni təhsilimizə inteqrasiya etdirmək fürsəti yaradır.

Çıxışda vurğulandı ki, proqramın məzunları yerli mütəxəssislərlə yanaşı, ABŞ-nin tanınmış professor-müəllim heyəti tərəfindən "təhsil siyasəti və idarəetməsi" üzrə mükəmməl təlim alaraq, zəruri kompetensiyalara yiyələniblər. Bu bacarıqların Azərbaycanda elmin və təhsilin inkişafına ciddi töhvələr verəcəyinə inanırıq.

Sonra CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin professoru Kolin Qrin məzunları təbrik etdi.

Mərasimdə çıxış edən elm və təhsil naziri Emin Əmrullayev təhsil idarəçiliyi sahəsində beynəlxalq təcrübənin ölkəmizə gətirilməsi və bu sahədə yüksək səviyyəli gənc mütəxəssislərin hazırlanmasının dövlət siyasətinin prioritet istiqamətlərindən olduğunu vurğulayaraq, proqramın icrasını bu baxımdan yüksək qiymətləndirdi. Nazir qeyd etdi ki, təkcə son beş-altı ildə bir neçə Azərbaycan universitetləri ilə nüfuzlu xarici universitetlər arasında ikili diplom proqramlarının icrası nəticəsində ölkəmizin yüzlərlə potensiallı gənclərinə Azərbaycanı tərk etmədən, dövlət hesabına nüfuzlü universitetlərdə təhsil almaq imkanı yaradılıb. Emin Əmrullayev bildirdi ki, ADPU-CVU ikili diplom proqramı üzrə ümumilikdə 130-a qədər gəncimizin təhsil siyasəti və idarəçiliyi sahəsində beynəlxalq səviyyəli mütəxəssislər kimi yetişdirilməsi gözlənilir.

Daha sonra CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin dekanı Maykl Foyerin videotəbriki nümayiş olundu.

Sonda "Təhsil siyasəti və idarəetməsi" üzrə ADPU-CVU birgə ikili diplom magistr proqramının 2022-2023-cü tədris ili məzunlarına fəxri diplomlar təqdim olunub.

Qeyd edək ki, Pedaqoji Universitetin Corc Vaşinqton Universiteti ilə "Təhsil siyasəti və idarəetməsi" üzrə birgə ikili diplom magistr proqramı artıq 3 ildir icra olunur və cari ildə də proqramın 40 nəfərlik qəbul planı tam dolub. Proqram Elm və Təhsil Nazirliyi, Dövlət Neft Fondu, Dövlət proqramlarının idarəetmə qrupunun dəstəyi ilə həyata keçirilir.

**Elm və təhsil naziri Emin Əmrullayev və rektor Cəfər Cəfərovun ADPU-CVU ikili diplom proqramı haqqında ADPU TV-yə eksklüziv müsahibələri**



## ADPU əməkdaşları üçün peşəkar təlim: Təhsil sahəsində ictimaiyyətlə effektiv əlaqə



İyunun 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) keçirilən "Təhsil sahəsində ictimaiyyətlə effektiv əlaqə" mövzusunda iki günlük peşəkar təlim proqramı yekunlaşıb.

ADPU-nun filialları, fakültələri, kolleci və digər müvafiq strukturlarının ictimaiyyətlə əlaqələr və marketinq siyasətinə məsul şəxsləri üçün nəzərdə tutulan təlim proqramı iştirakçılarda KİV və sosial media üçün xəbərlərin, məlumatların hazırlanması, press-relizlərin tərtibi qaydaları, diqqət edilməsi lazım olan məqamlar, tələb olunan əsas səriştələr, ifadə üsulları, sosial media resurslarından effektiv istifadə, təhsildə marketinq anlayışları və s. haqqında ətraflı təsəvvür yaratmaq, onların iş motivasiyasını artırmaq, komanda ruhunu formalaşdırmaq məqsədi daşıyır.

Proqram ərzində 34 nəfər iştirakçıya qeyd olunan istiqamətlər üzrə peşəkar təlimçilər Eltac Cəbiyev və Fəxrəddin Abdullayev, Bakı Dövlət Universitetinin dosenti, media eksperti Vəfa İsgəndərova, ADPU-nun mətbuat katibi, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Cavid Hüseynov, eləcə də şöbənin redaktoru Taleh Mirzəyev, qrafik dizeyneri Elvin Vahidov və SMM mütəxəssisi Asim İbrahimovun təqdimatında təlimlər keçirilib, praktik nümunələr təqdim olunub. İnteraktiv şəraitdə keçən təlimlərdə iştirakçıların sualları cavablandırılıb, qarşılıqlı diskussiya aparılıb.

Proqramın bağlanışında iştirak edən ADPU-nun rektoru prof. Cəfər Cəfərov iştirakçıları təbrik edərək, görülən məqsədyönlü tədbirlər sayəsində universitetin nüfuzunun günü-gündən artdığını qeyd edib. Rektor əməkdaşların sahələr üzrə peşəkar kompetensiyalarının inkişaf etdirilməsində bu kimi təlimlərin əhəmiyyətinə toxunaraq, həm korporativ, həm də şəxsi qaydada daimi inkişaf proqramlarına qatılmağın vacib olduğunu vurğulayıb.

Yekunda rektor prof. Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektor prof. Fikrət Rzayev və ADPU-nun Heydər Əliyev Mərkəzinin müdiri Tahir Süleymanov tərəfindən iştirakçılara müvafiq təsdiqedici sertifikatlar təqdim olunub.

## ADPU-nun prorektoru Belçikada səfərdə olub




Bakı Biznes Universitetinin koordinatoru olduğu, Avropa Komissiyası tərəfindən maliyyələşdirilən "Azərbaycan Rektorlar Konfransının yaradılması" layihəsi çərçivəsində növbəti səfər 3-7 iyul tarixlərində Belçikanın Brüssel şəhərinə baş tutub. Layihə konsorsiumunun üzvü olan 18 ali təhsil müəssisəsinin nümayəndələri Avropanın nüfuzlu EFMD təşkilatında 5 gün müddətində müxtəlif təlim-seminarlarda iştirak ediblər. Səfərdə Azərbaycan Dövlət Pedaqoji Universitetini tədris işləri üzrə prorektor dosent Eldar Aslanov təmsil edib. Səfərin ilk günündə layihənin koordinatoru Gülşən Bayramova və EFMD təşkilatının beynəlxalq layihələr üzrə direktoru Dr. Xristofe Terrass açılış nitqi ilə çıxış ediblər. Daha sonra Xristofe Terrass EFMD təşkilatının fəaliyyəti barədə geniş təqdimat edib. Növbəti təqdimatda isə Jan-Baptist Maillard EFMD təşkilatının beynəlxalq layihələrdəki böyük təcrübələrini Azərbaycan ali təhsil müəssisələrinin nümayəndə heyəti ilə bölüşüb. Məhsuldar günün yekun təqdimatları isə ali təhsil müəssisələrinin marketinq və kommunikasiya strategiyalarının, eləcə də, EFMD-nin bu istiqamətdəki təcrübələrinin, o cümlədən dövri nəşrlərinin müzakirəsinə həsr edilib.

Növbəti günlərdəki təlimlərdə "Belçikanın ali təhsil sistemində Flamand Universitetlərarası Şurasının rolu: Şuranın dövri nəşrləri" və "Belçikanın ali təhsil sistemində Rektorlar Şurasının rolu: Şuranın dövri nəşrləri" kimi mühüm mövzular əhatə olunub. Təlimlərin məqsədi Azərbaycan Rektorlar Konfransının dövri nəşrinin hazırlanması məqsədilə beynəlxalq təcrübənin, xüsusilə də Belçika təcrübəsinin öyrənilməsi olub. Təlimlər Şuraların məsul şəxsləri Koen Verlaeckt və Sofi Dufays tərəfindən həyata keçirilib.

Yekunda qarşılıqlı müzakirələr, fikir mübadilələri aparılıb.

## "Alqoritmika" tədris proqramının bağlanış mərasimi



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi ilə "Alqoritmika" şirkətinin əməkdaşlığı çərçivəsində ADPU-da təhsil alan tələbələr üçün təşkil olunan "Code for future" layihəsi çərçivəsində "Alqoritmika" tədris proqramının bağlanış mərasimi keçirilib.

Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, "Alqoritmika" şirkətinin nümayəndəsi Qəmər Məmmədova, Təhsildə Keyfiyyət Təminatı Agentliyinin İdarə Heyətinin sədri (TKTA İH) Ülkər Səttarova, "Rəqəmsal bacarıqlar" layihəsinin rəhbəri Nilüfər Rəhimova, universitetin professor-müəllim heyəti, layihəyə qatılan tələbələr, həmçinin layihənin məzunları iştirak ediblər.

Qeyd edək ki, 2023-cü ildə "Code for future" layihəsi çərçivəsində "Alqoritmika" tədris proqramından 214 nəfər məzun olub. Açılış nitqi ilə çıxış edən prof. Cəfər Cəfərov bildirib ki, Elm və Təhsil Nazirliyinin dəstəyilə Azərbaycan Dövlət Pedaqoji Universiteti tələbələrinin-gələcək müəllimlərin inkişafı üçün yeni üfüqlər açır. Son yeniliklərdən biri "Alqoritmika" tədris proqramının uğurlu icrasıdır. Proqram gələcək müəllimlərə müvafiq ixtisas səriştələri öyrətməklə, həmçinin onlara texnologiyaları kurikuluma problemsiz şəkildə inteqrasiya etməyi də mənimsədir.

Çıxış edənlərdən TKTA İdarə Heyətinin sədri Ülkər Səttarova və layihənin rəhbəri Nilüfər Rəhimova layihənin mahiyyəti, məzmunu, görülən işlər barəsində informasiya veriblər. Bununla yanaşı, "Alqoritmika" şirkətinin nümayəndəsi Qəmər Məmmədova tərəfindən layihənin icrasına dair təqdimat nümayiş etdirilib.

Daha sonra səhnəyə layihənin ən yüksək bal toplamış məzunlarından olan "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının tələbələri - Aysel Mayılova və Ülkər Aslanlı dəvət olunmuş, tələbələr layihə barəsində öz fikirlərini auditoriya ilə paylaşmışlar. Bağlanış mərasiminin sonunda ən yüksək bal toplayan 20 tələbəyə rektor Cəfər Cəfərov və TKTA İH sədri Ülkər Səttarova tərəfindən sertifikatlar təqdim olunub.

## ADPU Türkiyənin Ardahan Universiteti ilə əməkdaşlığa başlayır



İyulun 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyənin Ardahan Universitetinin nümayəndələri ilə görüş keçirilib. Görüşdə Ardahan Universitetinin beynəlxalq əlaqələr üzrə koordinatoru Doğan Saltaş, köməkçi Nurgül Moldayeva və ADPU-nun Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova iştirak edib.

Tərəflər təmsil etdikləri ali təhsil müəssisələri haqqında bir-birlərinə ətraflı məlumat verərək, əməkdaşlığın gələcəkdə daha da genişləndirilməsi haqqında müzakirələr aparıblar. Görüşün yekununda ilkin mərhələdə iki universitet arasında anlaşma memorandumunun imzalanması və ERASMUS+ tələbə-müəllim mübadiləsi çərçivəsində layihənin birgə hazırlanmasına razılıq əldə olunub.

## ADPU nümayəndə heyəti ECAR layihəsi çərçivəsində İspaniyada səfərdə olub

ADPU nümayəndə heyəti ECAR layihəsi çərçivəsində İspaniyada səfərdə olub.

Bakı Biznes Universitetinin koordinatoru olduğu və Avropa Komissiyası tərəfindən maliyyələşdirilən "Azərbaycan Rektorlar Konfransının yaradılması" – ECAR Erasmus+ layihəsi çərçivəsində növbəti səfər İspaniyanın Madrid şəhərinə baş tutub. 10-14 iyul tarixlərini əhatə edən səfərin əsas məqsədi İspaniya Rektorlar Konfransı və İspaniya ali təhsil müəssisələrinin, eləcə də Fransa, Polşa və Litvadan olan tərəfdaşların iştirakı ilə tələbə və məzun işləri üzrə həmin ölkələrin təcrübəsinin öyrənilməsidir.

Səfərdə Milli Məclisin deputatı, Elm və Təhsil Komitəsinin üzvü Tamam Cəfərova, Azərbaycan Respublikasının elm və təhsil nazirinin müşaviri Nicat Məmmədli, Nazirliyin Elm sektorunun müdiri Turxan Süleyman, o cümlədən, layihə konsorsiumunun üzvü olan 16 ali təhsil müəssisəsinin rektorları, prorektorları və digər məsul şəxslərindən ibarət 40 nəfərlik nümayəndə heyəti iştirak edib.

Bir həftə müddətində davam edən təlim-seminarların ilk günü Charles III Universitetində öz işinə başlayıb. Tədbirdə İspaniya Rektorlar Konfransının baş katibi Maria Teresa çıxış edərək, Azərbaycan nümayəndə heyətini salamlayıb və İspaniyada görməkdən məmnun olduqlarını qeyd edib.

Daha sonra Azərbaycan Respublikası elm və təhsil nazirinin müşaviri Nicat Məmmədli nümayəndələr adından İspaniyalı həmkarları salamlayıb və sıx əməkdaşlıqdan məmnunluğunu dilə gətirib. N.Məmmədli ali təhsil müəssisələrinin inkişafına verdiyi töhfələr baxımından ECAR layihəsi və digər beynəlxalq layihələrin xüsusi önəmindən bəhs edib.

Layihənin koordinatoru olan Bakı Biznes Universitetinin rektoru professor İbad Abbasov layihənin mühüm tərəfdaşlarından biri kimi İspaniya Rektorlar Konfransına öz



təşəkkürünü bildirib və əməkdaşlığın uğurla davam etdiriləcəyinə əminliyini ifadə edib. Rektor təhsilin qarşısında duran mühüm vəzifələrdən söz açıb və bu məqsədlə beynəlmiləlləşmə və inteqrasiyanın yüksək əhəmiyyət kəsb etdiyini vurğulayıb.

Çıxışlardan sonra İspaniya Rektorlar Konfransının baş katibi Maria Teresa Rektorlar Konfransının yaranması, İspaniya ali təhsil sistemində Konfransın yeri və rolu, strukturu, fəaliyyət istiqamətləri, müvafiq komitələri haqqında təqimat nümayiş etdirib və sualları cavablandırıb.

İspaniya Rektorlar Konfransının Tələbələrlə iş üzrə komissiyasının icraçı katibi prof. Angela Alcala isə məzmunlu təqdimatla çıxış edərək, İspaniya universitetlərində tələbələrlə iş üzrə məsələlərdə yeni strateji baxış, o cümlədən, sektorlararası münasibətlər və koordinasiyanın vacibliyindən danışıb.

Layihənin sonuncu görüşündə Azərbaycan Dövlət Pedaqoji Universitetini ümumi işlər üzrə prorektor Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, Filologiya fakültəsinin elmi işlər üzrə dekan müavini, f.ü.f.d. Könül Həsənova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli təmsil edib.

Yekunda sual-cavab sessiyası baş tutub, xarici ekspertlərlə faydalı fikir mübadilələri aparılıb.

## ADPU Azərbaycanda Beynəlxalq şagird qiymətləndirmə tədqiqatlarını təşkil edir







İyulun 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib.

Əvvəlcə, Şura üzvləri universitetin foyesində Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının sabiq əməkdaşı, mərhum dosent Hüseyn Hüseynovun ailəsi tərəfindən ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinə hədiyyə olunan şəxsi kitabxanasından ibarət sərgi ilə tanış olublar. Qeyd edək ki, alimin universitetə hədiyyə olunan ümumilikdə 304 nüsxədən ibarət kitabları içərisində Azərbaycan, rus və fars dilində əsərlər var.

İclası giriş nitqi ilə açan rektor professor Cəfər Cəfərov ötən dövr ərzində baş verən yeniliklərdən söz açaraq, qarşıda duran vəzifələrdən danışıb. Rektor universitetin imicinin yüksəldilməsi üçün icra olunan kompleks tədbirlərdən bəhs edərək, bu kimi fəaliyyətlərin davamlı olmasının vacibliyini vurğulayıb.

Nitqinin sonunda rektor Analitik kimya və kimyanın tədrisi texnologiyası kafedrasının əməkdaşı İsa Cəfərova dosent attestatını təqdim edib.

Daha sonra elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov "2022-2023-cü tədris ili üzrə magistrantların dissertasiya işlərinin müdafiəsi və yay imtahan sessiyasının yekunları barədə", Tədris Departamentinin direktoru dosent Sənan Əliyev isə "2022-2023-cü tədris ili üzrə bakalavrların yaz imtahan sessiyasının və buraxılış işlərinin müdafiəsinin yekunları barədə" hesabatları təqdim ediblər. Hesabatlarda qeyd olunur ki, ADPU-da cari ilin yay imtahan sessiyası ərzində bakalavriat səviyyəsi üzrə 10 014, magistratura səviyyəsində 333 nəfər (I tədris ili) olmaqla, ümumilikdə 10 347 nəfər tələbə imtahanlarda iştirak edib. İmtahan sessiyasının yekunlarına əsasən, tələbələrin bakalavriat səviyyəsində müvəffəqiyyət göstəriciləri 86 %, keyfiyyət göstəriciləri 59 %, magistratura səviyyəsində isə müvafiq olaraq 81 % və 72 % təşkil edib. 2023-cü ildə ADPU-nun magistraturasından "Təlim və tədrisin təşkili və metodikası (SABAH)" ixtisaslaşması üzrə 23 nəfər, MBA ("Təhsilin təşkili və idarə olunması") ixtisaslaşması üzrə isə 39 nəfər məzun olub. Magistrlik dissertasiyası müdafiə edən 266 nəfərdən 76 faizi 91-100 arası bal alıb, magistrantların 42 faizi isə fərqlənmə diplomu ilə məzun olublar.

Daha sonra strateji inkişaf məsələləri üzrə prorektor Könül Pirverdiyeva ADPU-nun Strateji İnkişaf Mərkəzi (SİM) tərəfindən ölkəmizdə icra olunan TALIS, TIMSS və ICILS beynəlxalq qiymətləndirmə tədqiqatları haqqında geniş hesabatla çıxış edib. Qeyd olunub ki, Azərbaycan 2023-cü ildə TIMSS və ICILS tədqiqatlarının əsas, TALIS 2024 tədqiqatının isə sınaq mərhələsində iştirak edib. TALIS İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (İƏİT) tərəfindən həyata keçirilən müəllimlərin və məktəb direktorlarının məktəblərdəki iş şəraitinə və öyrənmə mühitinə istiqamətlənən ilk beynəlxalq sorğudur. Ölkəmizin ilk dəfə qoşulduğu bu tədqiqatla bağlı SİM tərəfindən ilin əvvəlindən başlayaraq, Respublika üzrə müəllim və direktorlarla onlayn görüşlər təşkil olunub, yekunda, ümumilikdə 1348 müəllim sorğuya cəlb olunub.

Ölkəmiz ilk dəfə 2011-ci ildə TIMSS (Riyaziyyat və təbiət elmləri üzrə Beynəlxalq Qiymətləndirmə tədqiqatı) tədqiqatında iştirak edib. 4 ildən bir keçirilən bu beynəlxalq tədqiqatda orta məktəblərin IV və VIII sinif şagirdləri iştirak edir. Cari ildə ADPU SİM tərəfin TIMSS 2023 tədqiqatı ilə bağlı seçilmiş 199 məktəbin 234 sinfində IV sinif, seçilmiş 246 məktəbin 339 sinfində isə VIII sinif şagirdləri üçün imtahanlar təşkil olunub. Bununla bağlı əvvəlcə, bir neçə ay ərzində seçilmiş ADPU tələbələri, müəllimlər, şagirdlər və koordinatorlar üçün müvafiq təlimlər təşkil olunub.

ICILS (Kompüter və İnformasiya Savadlılığı üzrə Beynəlxalq Qiymətləndirmə Proqramı) 2013-cü ildən təşkil olunur. Azərbaycan ilk dəfə 2023-cü ildə bu tədqiqata qatılıb. ADPU SİM tərəfindən ICILS 2023 qiymətləndirmə tədqiqatının əsas mərhələsi üzrə təhsilverənlər və təhsilalanlar üçün təlim proqramları hazırlanıb və keçirilib, Naxçıvan MR və regionlarda imtahanlar həyata keçirilib. Komanda tərəfindən iyul ayı ərzində açıq sualların yoxlanılması prosesi icra olunub.

Qeyd edək ki, beynəlxalq şagird qiymətləndirmə tədqiqatları üzrə Milli Qiymətləndirmə koordinatoru, ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva TIMSS və ICILS 2023 tədqiqatları ilə bağlı Çexiya və Portuqaliyada işgüzar səfərlərdə olub.

Yekunda Şura təqdim olunan hesabatların qəbulu və "Heydər Əliyev irsi və müasir Azərbaycanın inkişafının bəzi məsələləri" məqalələr toplusunun nəşri, eləcə də, cari məsələlərlə bağlı müvafiq qərarlar qəbul edib.

## ADPU-da 16 ali təhsil və elmi-tədqiqat müəssisəsindən 160-dək iddiaçı üçün doktoranturaya qəbul imtahanları keçirilib



Sentyabr ayının 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) fəlsəfə doktoru proqramı üzrə 2023-cü il üçün doktoranturaya fəlsəfə fənnindən qəbul imtahanlarının keçirilməsinə başlanılıb.

Açılış nitqi ilə çıxış edən İmtahan Komissiyasının sədri, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov imtahanların təşkili ilə bağlı Elm və Təhsil Nazirliyinin müvafiq əmrini və imtahanların təşkili qaydalarını diqqətə çatdıraraq, vurğulayıb ki, proses təsdiq olunmuş qaydalar əsasında tam şəffaf şəkildə həyata keçirilir. Prorektor bildirib ki, ADPU-da elmi potensialın inkişafı üçün davamlı tədbirlər görülür.

Sentyabrın 4-dək davam edən imtahanlarda Azərbaycan Respublikası Təhsil İnstitutu, Azərbaycan Dövlət Pedaqoji Universiteti, Lənkəran Dövlət Universiteti, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti, Azərbaycan Dövlət Rəssamlıq Akademiyası, Azərbaycan Milli Konservatoriyası, Bakı Musiqi Akademiyası, Azərbaycan Universiteti, Qərbi Kaspi Universiteti, Odlar Yurdu Universiteti, Bakı Biznes Universiteti, Bakı Slavyan Universiteti, Bakı Xoreoqrafiya Akademiyası, Nizami Gəncəvi adına Milli Azərbaycan Ədəbiyyatı Muzeyi, Xəzər Universiteti və Azərbaycan Dillər Universiteti olmaqla, ümumilikdə 16 ali təhsil və elmi-tədqiqat müəssisəsindən 160-dək iddiaçı iştirak edib.

Qeyd edək ki, Pedaqoji Universitet Bakı şəhərində fəlsəfə doktoru proqramı üzrə doktoranturaya fəlsəfə fənnindən qəbul imtahanlarının keçirildiyi üç ali təhsil müəssisəsindən biridir. İmtahan Komissiyasının tərkibi ADPU və digər ali təhsil müəssisələrinin alimlərindən ibarətdir.

## ADPU Karamanoğlu Mehmetbey Universiteti ilə memorandum imzalayıb



Sentyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyənin Karamanoğlu Mehmetbey Universitetinin nümayəndə heyəti ilə görüş keçirilib.

Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və mütəxəssis Gülnar Ələkbərova, Karamanoğlu Mehmetbey Universitetindən isə rektor prof. Mehmet Gavgalı və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Uğur Aygün, həmçinin "Oxford" Xaricdə Təhsil Məsləhətçiliyinin qurucu direktoru Kənan Kərimov iştirak edib.

Görüşün əsas məqsədi tanışlıq və nəzakət ziyarəti, mümkün əməkdaşlıq əlaqələrinin müzakirəsi və bu çərçivədə əməkdaşlıq protokolunun imzalanması olub.

Görüş əsnasında tərəflər təmsil etdikləri ali təhsil müəssisələri haqqında bir-birlərinə ətraflı məlumat verərək əməkdaşlıq imkanlarını müzakirə ediblər.

Görüşün yekununda rektorlar prof. Cəfər Cəfərov və prof. Mehmet Gavgalı universitetlər arasında qarşılıqlı əməkdaşlığa dair memorandum və ERASMUS+ KA1 çərçivəsində müqavilə imzalayıblar.

# PEDAQOJİ UNİVERSİTET TƏDRİS İLİNƏ YENİLİKLƏRLƏ BAŞLAYIR




Dövlət İmtahan Mərkəzi tərəfindən keçirilən 2023-2024-cü tədris ili üçün ali təhsil müəssisələrinin bakalavriat səviyyəsinə tələbə qəbulunun nəticələrinə əsasən, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Azərbaycan və ingilis bölmələri üzrə qəbul planı 100 faiz dolub. Yalnız rus bölməsində bir neçə boş yer qalıb. Ümumilikdə isə ADPU-nun 2570 nəfərlik qəbul planı 96,42 faiz dolub. Beləliklə, ADPU-nun hər il qəbul planının yüksək faizlə dolması ölkəmizdə və universitetdə aparılan davamlı islahatların, müəllimlik peşəsinin artan nüfuzunun təbii məntiqi nəticəsidir. Xatırladaq ki, ötən il ADPU-nun qəbul planı 2470 nəfər idi.

Azərbaycan Dövlət Pedaqoji Universiteti bütün sahələr üzrə yüksək ixtisaslı pedaqoji kadr hazırlamaq missiyasına uyğun olaraq, dövrün tələblərini nəzərə alaraq, ilbəil yeni ixtisaslar üzrə kadr hazırlığını genişləndirir, təhsildə ən müasir innovativ texnologiyaları tətbiq edir.

Tələbələri üçün geniş imkanlar yaradan ADPU-da cari tədris ilindən bakalavriat səviyyəsi üzrə iki yeni ixtisas ("Dil və ədəbiyyat müəllimliyi (türk dili üzrə)", "Dil və ədəbiyyat müəllimliyi (rus dili üzrə)"), bir neçə ixtisasda isə rus və ingilis bölmələri, magistratura səviyyəsində bir yeni ixtisaslaşma ("Menecment (Ali təhsilin təşkili və idarə olunması)") üzrə qəbul aparılıb. Qeyd edək ki, yeni açılan ixtisaslar üzrə qəbul planları tam dolub. Eyni zamanda Pedaqoji Universitetdə 2023-2024-cü tədris ilindən etibarən tələbələrin ölkəmizin müxtəlif regionlarında təcrübə keçmələrini təmin edəcək pedaqoji internaturanın tətbiqinə start veriləcək.

Yeni tədris ilinə hazırlıqla bağlı görülən tədbirlərdən biri də müasir dövrün tələbləri nəzərə alınaraq, davamlı surətdə icra olunan elektron tədris resurslarının yaradılmasıdır. ADPU-da professor-müəllim heyətinin "Moodle" kabinetlərinin yaradılması üzrə müəllimlərə təlimlər və könüllü olaraq kabinetlərinin yaradılması prosesi bir ildən çoxdur ki, davam edir. Artıq sentyabr ayınadək ADPU, filiallar və kollecin 500 nəfərədək müəllimi "Moodle" kabineti yaratmışdır.

Məlum olduğu kimi, "Moodle" (Modular-Object-Oriented-Dynamic-Learning-Environment) - dünyada ən geniş yayılmış sərbəst, pulsuz, məsafədən və qeyri-sinxron öyrənmə sistemidir. Dünyanın bütün ölkələrində əlçatan olan bu sistem 82 dildə (Azərbaycan dilində də əsasən) dəstəklənir. Bu sistemdə ADPU-nun bütün müəllimlərinin dərslərinin və dərs materiallarının olması tələbələrin dərs materialları ilə təminatının yaxşılaşmasına, tədris resurslarına əlçatanlığın yüksəlməsinə böyük töhfə verəcək. Əsas amillərdən biri də fors-major hallarda (pandemiya və s., səbəblərdən əyani dərslərin dayandırılması) bu sistemlər vasitəsilə Universitetin tədris prosesini rahatlıqla davam etdirməsidir. Universitet Elmi Şuranın son iclasının qərarına əsasən, cari tədris ilindən başlayaraq müəllimlərin "Moodle" kabinetlərinin olması məcburidir.

Məlumat üçün bildirək ki, ADPU-da bakalavriat səviyyəsi üzrə 24 ixtisasda, magistratura səviyyəsi üzrə 28, doktorantura səviyyəsi üzrə isə 33 ixtisaslaşmada kadr hazırlığı həyata keçirilir.

Cari tədris ilində tələbə qəbulunun I turunun nəticələrinə əsasən, ADPU-nun I tədris ilinə qəbul olunanların sayında 2,3 % artım qeydə alınıb. I tədris ilinə qəbul olunanlar arasında ən çox artım III və V qruplardadır. III qrupda 6 %, V qrupda isə 6,5 % artım qeydə alınıb. Qəbul olanlardan 981 nəfəri 400-dən çox, 930 nəfəri 300-400 arası bal toplamış şəxslərdir. Bu il subbakalavr yolu ilə ADPU-ya qəbul olan yoxdur.

Qəbul olunanlardan 138 nəfəri güzəşt kateqoriyası üzrə qeydiyyatdan keçib. Bundan əlavə ötən illə müqayisədə yeni qəbul olunanlar arasında dövlət sifarişi ilə təhsil alacaq tələbələrin sayında da 2,4 % artım qeydə alınıb. Ümumilikdə isə, cari tədris ilinin I tur qəbul nəticələrinə əsasən, qəbul olunan tələbələrin 64 %-i dövlət sifarişi əsasında təhsil alacaq. Güzəşt kateqoriyalarına aid olan ödənişli əsaslarla təhsil alan tələbələrin də təhsil haqqının dövlət büdcəsinin vəsaiti hesabına ödənildiyi nəzərə alınarsa, bu nisbətin 70 % təşkil edir.

Ödənişli əsaslarla təhsil alan tələbələrimiz üçün təhsilin əlçatanlığını təmin etmək məqsədi ilə ADPU I tədris ilinin tələbələrinə qeydiyyat zamanı təhsil haqqının 50 faizini ödəməyə imkan yaradır. Bunlarla yanaşı, tələbələrimiz Tələbə Təhsil Krediti Fonduna müraciət edərək, sərfəli şərtlərlə təhsilhaqqı kreditindən də yararlanırlar. Belə ki, ötən tədris ilində 399 nəfər ADPU tələbəsi tələbə təhsil kreditindən yararlanıb. Cari ildə də qeydiyyat prosesində tələbə təhsil kreditinə müraciət edənlərin sayı 48 nəfərdir.

ADPU-da magistratura səviyyəsi üzrə qəbul nəticələri də yüksək qiymətləndirilməkdədir. Belə ki, 2023-2024-cü tədris ilində 440 plan yeri 100 faiz dolmuş, müəyyən səbəblərdən 10 nəfər qeydiyyatdan keçməmişdir. Nəticədə yekun qəbul nisbəti 97.7 % təşkil edib.

Magistratura səviyyəsində bir sıra ixtisaslaşmalar üzrə qəbul ballarının əvvəlki illərə nisbətən artması da diqqəti cəlb edir. "Pedaqogika" ixtisasının "Təlim və tədrisin təşkili və metodikası (SABAH)" ixtisaslaşması üzrə 2023-2024-cü tədris ilində dövlət sifarişli 30 plan yeri tam dolmuş, ixtisas üzrə keçid balı 74, ən yüksək nəticə isə 90,5 bal təşkil etmişdir.

2021-2022-ci tədris ilindən qəbul aparılan MBA proqramı üzrə "Biznesin təşkili və idarə edilməsi (təhsilin təşkili və idarə edilməsi)" ixtisaslaşmasının keçid balı 58 bal, ən yüksək nəticə isə 94 bal olmuşdur.

ADPU-nun magistraturalarına dövlət sifarişi əsasında ən aşağı keçid balı "Təsviri incəsənət müəllimliyi" ixtisasının "Təsviri incəsənət fənninin tədrisi metodikası və metodologiyası" ixtisaslaşmasında (58,5 bal), ən yüksək keçid balı isə "Tarix müəllimliyi" ixtisasının "Tarix fənninin tədrisi metodikası və metodologiyası" ixtisaslaşmasındadır (81 bal).

## Bilik Günü: Pedaqoji Universitet tələbələrini qarşıladı

Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində yeni tədris ilinin başlanması və 15 sentyabr - Bilik Günü münasibətilə tədbir keçirilib.

Azərbaycan Respublikasının Dövlət Himninin ifa olunmasından sonra ADPU-nun rektoru professor Cəfər Cəfərov universitetə yeni qəbul olunan tələbələr qarşısında çıxış edib.

Rektor Cəfər Cəfərov şərəfli müəllimlik peşəsini seçərək ADPU-nun tələbəsi adını qazanan gəncləri təbrik edərək, onlara təhsil həyatlarında uğurlar arzulayıb. Pedaqoji Universitetin zəngin tarixindən danışaraq indiyək Azərbaycan və xarici ölkələr üçün 170 mindən çox yüksək ixtisaslı müəllim kadrları yetişdirdiyini, universitetin məzunları arasında ölkəmizin elmi-mədəni və ictimai həyatında əhəmiyyətli rol oynamış onlarla görkəmli şəxsiyyətlərin olduğunu qeyd edib.

Prof. C.Cəfərov vurğulayıb ki, Pedaqoji Universitet "Ənənələrə sadiq, yeniliklərə açıq universitet" olaraq gəncləri ənənələri mənimsəyib milli-vətənpərvər ruhlu sağlam vətəndaş, yenilikləri, dünya trendlərini izləyərək ixtisasından asılı olmayaraq, İT və xarici dil biliklərini daim artıran, yüksək ünsiyyət bacarığına malik olan əsl mütəxəssis kimi formalaşmağa dəvət edib.

Daha sonra 626 balla ADPU-nun "Riyaziyyat müəllimliyi" ixtisasına qəbul olunan Aynur Ağayeva öz təəssüratlarını bölüşərək,



hər şeyin müəllimdən, onun aşıladığı bilgi və dəyərlərdən başladığını, məhz buna görə də, peşəkar müəllim kimi yetişmək üçün müəllimlər ocağı olan Azərbaycan Dövlət Pedaqoji Universitetini seçməyinin heç də təsadüfi olmadığını qeyd edib. "Əslində, 600-dən yüksək balla ADPU-nu seçməyim olduqca məntiqlidir. Çünki Azərbaycanda dövlət səviyyəsində aparılan təhsil siyasəti, müəllimliyin nüfuzunun qalxması və buna müvafiq olaraq Pedaqoji Universitetdəki inkişaf və yeniliklər, şəffaf və yüksək tədris mühiti hər bir uğurlu gələcək qurmaq istəyən istedadlı gənci bura cəlb edir." - deyə Aynur vurğulayıb.

## Tələbə təşkilatlarının forumu keçirilib




Sentyabrın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşkilatçılığı ilə tələbə təşkilatlarının forumu keçirilib.

Qeyd olunub ki, forum fakültəyə yeni qəbul olunmuş tələbələrin universitetin ictimai-sosial həyatı haqqında məlumatlılığının artırılması və təkliflərinin dinlənilməsi məqsədilə təşkil edilib.

Əvvəlcə müzəffər Azərbaycan Ordusunun uğurlu antiterror tədbirlərində canını fəda etmiş şəhidlərimiz bir dəqiqəlik sükutla yad olunub. Sonra elmi işlər üzrə dekan müavini Könül Həsənova Filologiya fakültəsinin uğurlarından danışıb. O ictimai fəaliyyətin tələbələr üçün əhəmiyyətini vurğulayıb.

"Meh" ədəbi dərnəyinin rəhbəri Raman İsmayılov dərnəyin məqsədi, fəaliyyəti və uğurları haqqında məlumat verib. O qeyd edib ki, 2019-cu ildə ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekanı vəzifəsini icra edən professor Mahirə Hüseynovanın təşəbbüsü ilə yaradılan dərnək ölkə və beynəlxalq miqyasda layihə və tədbirlər həyata keçirib.

Sonra "Meh"in fəaliyyəti barədə videoçarx nümayiş olunub.

ADPU-nun UNESCO klubunun prezidenti Əhmədağa Babaşov burada tələbələr üçün yaradılan şəraitdən bəhs edib.

Tədbirdə UNESCO barədə videoçarx təqdim olunub.

Tələbə Gənclər Təşkilatının (TGT) sədri Təhmasib İmaməliyev ADPU TGT-nin fəaliyyəti, strukturu və uğurları barədə məlumat verib. O qeyd edib ki, gənclərin ictimai fəaliyyətinin artırılması və asudə vaxtlarının səmərəli təşkili məqsədilə yeni layihələr həyata keçiriləcək.

ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin sədri Nərgiz Quluzadə tələbələrin inkişafı üçün hazırlanan layihələrdən söz açıb. ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsi haqqında isə təşkilatın sədr müavini Camilə Qurbanova məlumat verib.

Sonda qiraətçi Camilə Məmmədova Mahirə Nağıqızının "Mən səni özüm kimi" şeirini səsləndirib. Tədbir tələbələri maraqlandıran mövzuların müzakirəsi ilə davam edib.

## ADPU-nun müəllimi və tələbələri "Teknofest 2023"ün finalçısı olublar



Azərbaycan Dövlət Pedaqoji Universitetinin Riyaziyyat fakültəsinin Kompüter elmləri kafedrasının müəllimi Xumarə Qəhrəmanlı 30 avqust – 3 sentyabr aralığında baş tutan "Teknofest 2023" Ankara Girişim Yarışmasının finalçısı olub. Layihə metadünyada unikal təhsil məkanı və alətləri yaradaraq təhsilə inqilabi yeniliklər gətirməyi hədəfləyən "Google for Startups", "Microsoft for Startups" kimi müxtəlif proqramların dəstəyi ilə inkişaf etməkdə olan qabaqcıl təhsil texnologiyası startapıdır. Unikal rəqəmsal təhsil platforması vasitəsilə istifadəçilər virtual reallıq eynəkləri, kompüter və mobil cihazları vasitəsilə dünyanın istənilən yerindən interaktiv, maraqlı və əyləncəli tədris – öyrənmə və öyrətmə prosesinə qoşula bilərlər.

Eyni zamanda ADPU-nun SABAH qruplarının "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının məzunu, hazırda ADPU-da "İnformatikanın tədrisi metodikası və metodologiyası" ixtisası üzrə magistr tələbəsi olan Raya Həsənova və ADPU-nun SABAH qruplarının "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının V tədris ili tələbəsi Elmira Poladova da komanda yoldaşları ilə birgə festivalın finalına yüksəlmiş kənd təsərrüfatının rəqəmsallaşdırılmasına əsaslanan "Azirrigation" layihəsi ilə iştirak ediblər.

Finalçılar layihələrini Türkiyə Texnoloji Takımı, "Baykar Tech" və Teknofest İdarə Heyətinin sədri Səlçuk Bayraktara və Türkiyə dövlət rəsmilərinə, festivalın hakimlərinə təqdim edərək, sualları cavablandırıblar.

Qeyd edək ki, həm ADPU-nun müəllimi Xumarə Qəhrəmanlının, həm də tələbələrin layihələri Türkiyənin və dünyanın dörd bir yanından təqdim olunan startaplar içərisində müvafiq kateqoriyalar üzrə ilk beşliyə düşüb.

Xumarə müəllimə deyir ki, biz burada təcrübə qazanaraq ilk üçlüyə düşməyi və mükafatı prezidentin özündən almağı hədəfləyirik.

## Nüfuzlu xarici universitetlərdə təqaüdlü təhsil alan məzunlarımız



Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və ABŞ-nin Corc Vaşinqton Universiteti arasındakı beynəlxalq ikili diplom magistr proqramının məzunu Şəms Səfərəliyeva "Erasmus Mundus" proqramı çərçivəsində "Ali təhsildə innovasiya və tədqiqat (Innovation and research in higher education)" sahəsində magistratura təhsili alacaq. 2 illik proqram müddətində Şəms Avstriya, Finlandiya, Almaniya, eləcə də Çin və Hindistanın ali təhsil sistemlərini tədqiq edəcək.

ADPU-nun "SABAH magistratura" proqramının "Təlim və tədrisin təşkili və metodikası" ixtisaslaşmasının məzunu Rasim Həsənzadə isə "Türkiye Bursları" çərçivəsində Türkiyənin Gazi Universitetində "Təhsil proqramları və tədris (Eğitim programları ve öğretim)" ixtisasında tam təqaüdlə doktorantura səviyyəsinə qəbul olunub.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Kimya müəllimliyi" ixtisasının məzunu Məmmədzadə Nuray Yolçu qızı "Gənclərin xarici ölkələrin nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına dair 2022-2026-cı illər üçün Dövlət Proqramı"nın qaliblərindən biri kimi magistratura təhsilini Böyük Britaniya və Şimali İrlandiya Birləşmiş Krallığının aparıcı tədqiqat universitetlərindən olan Lester Universitetində "Kimya" ixtisası üzrə davam etdirəcək.

Qeyd edək ki, Nuray ümumilikdə Almaniya, İsveç və İtaliyada yerləşən Avropanın 9 nüfuzlu universitetindən qəbul alıb.

Məlumat üçün bildirək ki, Nuray Məmmədzadə Yevlax şəhərində anadan olub. 2019-2023-cü illərdə ADPU-da bakalavr təhsili alıb.

Tələbəlik dövründə Pedaqoji Universitetdə keçirilən IELTS imtahanlarında uğur qazanıb. Pedaqoji təcrübəsini Azərbaycan Britaniya Kollecində keçən Nuray burada ingilis dilində kimya fənnini tədris edib.

## ADPU-nun 2023-cü il məzunlarının 98,6 faizinin məşğulluğu təmin olunub

Sentyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib. İclası açan ADPU-nun rektoru professor Cəfər Cəfərov cari ilin 19-20 sentyabrında müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin əmri ilə Qarabağda həyata keçirilən uğurlu antiterror əməliyyatlarından söz açaraq, şəhidlərimizin əziz xatirəsini bir dəqiqəlik sükutla yad edib. Rektor qeyd edib ki, uğurlu antiterrer əməliyyatlarının yekununda regionda olan erməni seperatçıları ağ bayraq qaldırmağa məcbur oldu və Xankəndidəki erməni icmasının nümayəndələri ilə Yevlax şəhərində reinteqrasiya məsələləri barədə görüş keçirildi. Beləliklə, Azərbaycan öz suverenliyini tam bərqərar edərək ermənisilli əhalinin sürətli reinteqrasiyası məsələlərinin həllinə başladı.

Daha sonra pedaqogika elmləri doktoru Tamilla Əhməd qızı Vahabovaya elmlər doktorluğu diplomu təqdim olunub.

Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov ADPU-nun 2023-2024-cü tədris ilinə hazırlığı haqqında hesabatla çıxış edib. Pedaqoji Universitet məzunlarının 2023-cü il üzrə məşğulluğu barədə məlumat verən prorektor vurğulayıb ki, cari ildə ADPU-nun bakalavriaturasından 2025 nəfər məzun olub ki, onlardan 406 nəfər Azərbaycanda magistraturaya qəbul olunub, 80 nəfər xaricdə bakalavriat, magistratura, fəlsəfə doktoruğu və digər proqramlara qəbul olunub. 576 nəfər MİQ imtahanında iştirak edərək uğur qazanıb. Məzunlardan 102 nəfər dövlət, 268 nəfər qeyri-təhsil özəl sektor müəssisələrində, 398 nəfər isə özəl təhsil müəssisə və şirkətlərində əmək fəaliyyətinə başlayıb. 162 nəfər hərbi xidmətdədir. Beləliklə, ADPU-nun ötən tədris ili üzrə məzunlarının ümumi məşğulluğu 98,6 faiz, təhsil üzrə məşğulluğu isə 85,1 faiz təşkil edir. Qeyd olunub ki, ADPU və filialları üzrə cari ildə ümumilikdə 3900 nəfərlik plan yeri 96,07, ADPU-nun magistaturası üzrə 440 nəfərlik və Pedaqoji Kollec üzrə 1075 nəfərlik plan yeri 100 faiz dolub.



Hesabatda bildirilir ki, 2023-2024-cü tədris ili üçün ölkə üzrə pedaqoji ixtisaslara ayırılan plan yerlərinin 30 faizi ADPU-nun, pedaqoji kadr hazırlığı həyata keçirən ali təhsil müəssisələri filialları arasında isə ümumi qəbul planının 76 faizi ADPU-nun filiallarının payına düşür. Dos. E.Aslanov diqqətə çatdırıb ki, cari tədris ilində ADPU-ya qəbul olunan tələbələrin 64,1 faizi dövlət sifarişi əsasında qəbul olunub, 5,5 faizi isə güzəşt kateqoriyalarına daxil olduğu üçün təhsil haqları dövlət büdcəsinin vəsaiti hesabına ödəniləcək. Beləliklə, bu il də ADPU-ya qəbul olunan bakalavrların 70 faizə qədəri dövlət hesabına təhsil alacaq. Hesabatda ADPU-da həyata keçirilmiş professor-müəllimlərin işə qəbulu üzrə müsahibə haqqında da məlumat verilərək qeyd olunub ki, ümumilikdə 383 namizəd müsahibələrdə iştirak edib. Müsahibələr müəllimlərin təhsili, təcrübəsi, son 5 illik reytinq qiymətləndirmə nəticələri, xarici dil müəllimlərində müvafiq ixtisas üzrə beynəlxalq sertifikatları, tələbə sorğularının nəticələri, apellyasiya qeydləri, "Moodle" kabinetinin olması, "Microsoft Certified Educator" imtahan nəticəsi kimi meyarlar əsasında aparılıb.

Hesabatın yekununda qarşıda duran vəzifələr çərçivəsində ADPU-nun yeni baza məktəblərinin yaradılacağı qeyd olunub.

Daha sonra cari məsələlər müzakirə olunub.

## ADPU rəhbərliyi Zəfər parkını ziyarət edib



Sentyabrın 27-də Anım Günü münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru professor Cəfər Cəfərov və universitetin müvafiq struktur rəhbərləri Bakıda inşası davam etdirilən Zəfər parkını ziyarət ediblər. Universitet kollektivi parkın girişində xatirə daşının önünə gül dəstələri qoyub, ölkəmizin ərazi bütövlüyü və torpaqlarımızın azadlığı uğrunda canlarını fəda etmiş şəhidlərimizin əziz xatirəsini ehtiramla yad edib.

## ADPU-da Anım Günü qeyd olundu



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 27 Sentyabr - Anım Günü münasibəti ilə Ulu Öndər Heydər Əliyevin universitetin foyesində ucaldılmış abidəsi ziyarət olunub, Vətən uğrunda canlarından keçən şəhidlərimizin və Ulu Öndərin ruhu yad edilib.

Daha sonra Universitet rəhbərliyi auditoriyalarda ADPU-da təhsil alan şəhid ailəsi üzvü olan tələbələrlə görüşüb, şəhidlərimizin hər birimizin qürur yeri olduğu vurğulanıb. Bildirilib ki, hər bir şəhid ailəsi üzvü bizə müqəddəs əmanətdir və Azərbaycan dövləti hər bir şəhid yadigarına ən yüksək qiymət verir. Bu gün separatçılardan tam təmizlənən və çiçəklənən Qarabağ və Şərqi Zəngəzur şəhidlərimizin ruhuna ən ali hədiyyədir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ


AZƏRBAYCAN DÖVLƏT
PEDAQOJİ UNİVERSİTETİ

## PEDAQOJİ UNİVERSİTETDƏ QDF RƏHBƏRLİYİ İLƏ “QARABAĞIN DİRÇƏLİŞİNDƏ HƏMRƏYLİYİN ROLU” MÖVZUSUNDA GÖRÜŞ TƏŞKİL EDİLİB



Sentyabrın 28-də gənclərin maarifləndirilməsi məqsədilə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “Qarabağın dirçəlişində həmrəyliyin rolu” mövzusunda görüş keçirilib.

Qarabağ Dirçəliş Fondunun (QDF) təşəbbüsü ilə baş tutan və “#KarabakhTalks” müzakirələr platforması çərçivəsində keçirilən görüşdə Fondun İdarə Heyətinin sədri Rəhman Hacıyev, Dövlət Pedaqoji Universitetinin rektoru professor Cəfər Cəfərov, eləcə də ADPU-nun professor-müəllim heyəti və 400-ə yaxın tələbəsi iştirak edib. İlk olaraq Vətənimizin ərazi bütövlüyü və suverenliyi uğrunda canlarını fəda etmiş şəhidlərimizin aziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbirdə açılış nitqi ilə çıxış edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru Cəfər Cəfərov Vətən müharibəsində qazandığımız möhtəşəm qələbədən sonra qarşımızda duran əsas vəzifələrdən danışıb.

Bu sahədə gənclərin və tələbələrin üzərinə də böyük məsuliyyət düşdüyünü deyən rektor, Qarabağın bərpası ilə bağlı aparılan müzakirələrdə və keçirilən tədbirlərdə tələbələrin də fəal iştirak etmələrinin təqdirəlayiq hal olduğunu söyləyib. Prof. Cəfər Cəfərov bildirib ki, Pedaqoji Universitret də Qarabağda təhsilin inkişafında verə biləcəyi dəstəyi göstərmək, tələbələr üçün təcrübə proqramları təşkil etmək niyyətindədir.

Qeyd olunub ki, ADPU bu ildən başlayaraq tələbələrin regionlarda pedaqoji təcrübə keçməsini nəzərdə tutan pedaqoji internaturanın tətbiqinə start verir və gələcəkdə Azərbaycanın bir çox dilbər guşələrində, o cümlədən, Qarabağ və Şərqi Zəngəzurda da tələbələrin pedaqoji internatura keçmələri planlaşdırılır.

Sonra erməni işğalçıları tərəfindən Qarabağda dağıdılan tarixi abidələrimizə həsr edilən videoçarx nümayiş etdirilib. Qarabağ Dirçəliş Fondunun İdarə Heyətinin sədri Rəhman Hacıyev təqdimatla çıxış edərək görüş iştirakçılarına Prezident İlham Əliyevin 4 yanvar 2021-ci il tarixli Fərmanı əsasında yaradılan QDF-in fəaliyyətinin əsas istiqamətləri, görülmüş işlər və nəzərdə tutulan layihələr barədə ətraflı məlumat verib.

Hazırda işğaldan azad edilən ərazilərdə genişmiqyaslı bərpa-quruculuq işləri aparıldığını deyən Rəhman Hacıyev bildirib ki, dəyən zərərin nəticələrini tez bir zamanda aradan qaldırmaq və Qarabağı yüksək rifahlı regiona çevirmək üçün həmrəylik nümayiş etdirmək mütləqdir.

Qarabağın bərpasında gənclərin rolundan danışan Rəhman Hacıyev tələbələrlə mütəmadi görüşlərin keçirilməsinin bu baxımdan böyük əhəmiyyət daşıdığını söyləyib.

Sonra Qarabağ Dirçəliş Fondunun həyata keçirdiyi tədbirlərə və görüşlərə həsr olunan videoçarx nümayiş olunub. Çıxışlardan sonra görüş müzakirələr və sual-cavab sessiyası ilə davam edib. Tələbələr sual-cavab sessiyasında olduqca fəal iştirak ediblər. Rəhman Hacıyev onların ünvanladıqları çoxsaylı sualları cavablandırıb.

Qeyd edək ki, Qarabağ Dirçəliş Fondu bir neçə ali təhsil müəssisəsində gənclər və tələbələrin iştirakı ilə maarifləndirici görüşlər keçirib və analoji görüşlərin digər təhsil müəssisələrində də keçirilməsi nəzərdə tutulur.

## ADPU-NUN KİTABXANA-İNFORMASİYA MƏRKƏZİNİN 2023-CÜ İLİN İLK ALTI AYI ÜZRƏ FƏALİYYƏT GÖSTƏRİCİLƏRİ

Ümumi fond – 747998 nüsxə
Kitab fondu – 672400 nüsxə
E- kataloqda – 13263 adda 83257 nüsxə
Oxucular – 9646 nəfər
Kitab verilişi – 10829 nüsxə
Oxuculara verilmiş ədəbiyyat elm sahələrinə görə: dərslik – 7398, elmi – 277, bədii – 2954, ictimai-siyasi – 200 nüsxə
Cavablandırılmış sorğular – 17646
E-kitabxana istifadəçiləri – 4455 nəfər
Kənar oxucular – 46 nəfər
Yeni daxil olan nəşrlər – 445 adda 1051 nüsxə, o cümlədən, dissertasiya – 1, avtoreferat – 1, proqram - 205, dövri-elmi nəşrlər – 5 adda 10 nüsxə, digər jurnallar – 10 adda 20 nüsxə.



**Tədbirlər:**

- Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev İli" elan edilməsi ilə bağlı "Heydər Əliyev-100" adlı sərgi
- Nadir kitabların sərgisi
- Beynəlxalq universitetlərdə istifadə edilən, BP tərəfindən Azərbaycan dilinə tərcümə olunmuş 4 dərsliyin təqdimatı
- Tələbələrin III Respublika Elmi konfransında iştirak
- Magistrantların VI Elmi konfransında təşkil olunmuş dövri-elmi nəşrlərin sərgisi
- Əlamətdar və tarixi günlərə dair 3 sərgi



*Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 2672*

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.